**UOT:** 069.7
**KBT:** 719.
**MJ №** 188

# Azərbaycan tarixinin orta əsr məsələləri Heydər Əliyev irsində

**Şahlar Şərifov***

**Abstrakt.** Ümummilli lider Heydər Əliyevin milli və mədəni irsimizin qorunması uğrundakı unudulmaz xidmətləri maddi və mənəvi mədəniyyətimizin yaşadılmasına xidmət etmişdir. Tarixi şəxsiyyətlərin şərəfinə ucaldılmış abidələr, tarixi və mədəni abidələrin qorunması, beynəlxalq səviyyədə tanınan şəxsiyyətlərin yubileylərinə həsr edilən tədbirlərin qeyd edilməsi, deportasiya və soyqırımlar haqqında sərəncamların verilməsi və bir sıra digər vacib hadisələr bu dahi şəxsin adı ilə əlaqədardır.

Heydər Əliyevin elmi əsaslara istinadən söylədiyi qənaətlər sayəsində həm Sovetlər dövründə, həm də müstəqillik illərində dünya ictimaiyyətinə Azərbaycan xalqının qədim mədəniyyəti haqqında məlumatlar təqdim edilmişdir. Bununla yanaşı orta əsrlərə dair tarixi, dini abidələrin, eləcə də yazılı mənbələr və tarixi şəxsiyyətlərə aid məlumatların üzə çıxarılması və qorunması da unudulmaz liderin başlıca vəzifələri sırasında idi.

**Açar sözlər:** Heydər Əliyev, Azərbaycan, Kitabi Dədə Qorqud, Atabəylər, İçərişəhər, Yusif ibn Küseyr türbəsi, Möminə Xatun türbəsi, Bibiheybət məscidi, Təzəpir məscidi

## 1.Giriş

Azərbaycan tarixinin dərindən araşdırılması, tarixi dəyərlərimizin qorunması, tədqiq olunması, sonrakı nəsillərə çatdırılması Azərbaycan tarix elmində ən aktual məsələlərdən hesab olunur. Çünki tarixi, milli və mənəvi dəyərlərimizin xalqın və milli dövlətçiliyimizin formalaşmasında böyük və əvəzedilməz rolu vardır. Hər bir xalqın və dövlətçiliyin mövcudluğunun əsas amillərindən biri olan tarixi dəyərlər onun ən qiymətli sərvəti hesab olunur.

* İlahiyyat üzrə fəlsəfə doktoru, dosent,
AMEA A.A.Bakıxanov adına Tarix İnstitutunun "Azərbaycanın VII-XIV əsrlər tarixi" şöbəsinin aparıcı elmi işçisi; Bakı, Azərbaycan
E-mail: shahlarsharifov@gmail.com
https://orcid.org/0000-0002-0395-5174

**Məqaləyə istinad:** Şərifov, Ş. [2023] Azərbaycan tarixinin orta əsr məsələləri Heydər Əliyev irsində. *"Metafizika" jurnalı, 6(4),* səh. 83-97.

**Məqalənin tarixçəsi:**
*Məqalə redaksiyaya daxil olmuşdur: 18.09.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 16.10.2023*
*Çapa qəbul edilmişdir: 01.12.2023*

Tarixi dəyərlərimizi müqəddəs bilərək ona sahib çıxan hər bir azərbaycanlı, qarşıya çıxan bütün çətinliklərə baxmayaraq, onu qoruyaraq günümüzə qədər gətirib çıxara bilmişdir. Bu eyni zamanda milli ruhun simvolu olaraq tarixi yaddaşın formalaşması deməkdir. Müstəqilliyin yenidən əldə edilməsindən sonra milli-mənəvi dəyərlərimizin formalaşması üçün yeni şərait yaranmışdır. Bu baxımdan ulu öndər Heydər Əliyev də Azərbaycan tarixinə, xüsusilə Azərbaycanın orta əsrlər tarixinə diqqət və qayğı ilə yanaşmışdır. Bununla əlaqədar olaraq 1993-cü ilin 21 sentyabrında AMEA-da təşkil edilən görüşdə iştirak edən Heydər Əliyev ziyalılar qarşısında belə demişdir:

> "O vaxtlar Sovetlər İttifaqının çərçivəsində başqa respublikalarla öz işimizi müqayisə edirdik. Həmin respublikaların tarixçilərinin işləri ilə tanış olarkən daha da narahat olurduq ki, nə üçün onlar öz tarixlərini yaza bilirlər, biz isə yaza bilmirik.
>
> Düzdür, bunun müəyyən obyektiv səbəbləri var idi. Məsələn, bəzi xalqların əsrlər boyu yaxşı tarixçiləri olub. Onlar tarix yazıblar, sonrakı nəsillər üçün böyük tarixi abidələr qoyublar. Bunlar bizdə də var. Məsələn, bizim Əlyazmalar Fondunda çox dəyərli, zəngin məlumat verən kitablar var. Amma məsələ tək bunda deyildir... Ola bilər ki, Sovetlər İttifaqında yaranmış şərait də buna imkan vermirdi...
>
> ...Təəssüflər olsun ki, bunlardan lazımi qədər istifadə edilməyib. Bu gün nə üçün bu mövzuya toxunuram? Əgər biz Azərbaycanı müstəqil bir dövlət kimi dünyaya yaxşı tanıtmaq istəyiriksə, Azərbaycanın əsrlər boyu keçdiyi yolu gərək öz vətəndaşlarımıza, həm də bütün ölkələrdə olan elm adamlarına, respublikamıza maraq göstərən adamlara tanıdaq. Bu sahədə də tarixçilərimizin qarşısında çox böyük vəzifələr durur, onların üzərinə böyük məsuliyyət düşür... Bu 70 illik sovet dövründə tarix, ümumiyyətlə dünya tarixi, o cümlədən Azərbaycan tarixi, habelə keçmiş sovet ittifaqının ərazisində yaşayan digər millətlərin tarixi təhrif edilib. Nə üçün təhrif edilib? Çünki o vaxt vəziyyət belə idi və bu, çox adi bir hal idi..." [Əliyev 1997, 1-ci kitab, s.154-155; Hüseynova, s.41-42].

Heydər Əliyevin ziyalılar qarşısında söylədiyi bu nitqindən onun Azərbaycan tarixinə verdiyi dəyər son dərəcə aydın şəkildə məlum olur. Baxmayaraq ki, həmin dövr Azərbaycan tarixində ən ağır dövrlərdən biri olmuşdur. Azərbaycan Respublikası ilə qondarma respublika olan Ermənistan arasında müharibə gedirdi. 1994-cü ildə Heydər Əliyevin səyləri ilə baş tutan "Bişkek müqaviləsi" əsasında iki dövlət arasında hərbi atəşkəs əldə olunmuşdur. Hərbi atəşkəsin əldə olunmasından sonra bu sahəyə Heydər Əliyev tərəfindən daha çox diqqət ayrılmışdır.

1997-ci il yanvarın 31-də Respublika sarayında AMEA-nın alimləri ilə yenidən görüşən Heydər Əliyev, Azərbaycan tarixinin tədqiqi məsələlərinə toxunaraq belə demişdir:

“Xatırlaya bilərsiniz, 70-ci illərdə mən dəfələrlə AMEA-nın qarşısında vəzifə qoymuşdum ki, Azərbaycanın tarixi yazılmalıdır. Amma bu gün mənim haqqım var deyim ki, tarixçilərimiz bu vəzifəni yerinə yetirmədilər, Azərbaycanın tarixi yazılmamışdır. Bizim tarixçilərimiz bir tərəfdən çəkişmə ilə məşğul oldular, hərə öz konsepsiyasını irəliyə aparmağa çalışdı. Amma Azərbaycanın tarixi yazılmalıdır... Məktəbə gedən gənc gərək Azərbaycanın tarixini bilsin, oxusun, öyrənsin. Amma o, köhnə dərsliklərdən bunu öyrənə bilməz. Dərsliyi də hərə öz istədiyi kimi yazmamalıdır. Gərək bizim xalqımızın tarixi yazılsın ki, onun əsasında da gənclər üçün, orta və ali təhsil məktəbləri üçün tarix dərslikləri yazılsın...” [Əliyev 1998, s.367].

Heydər Əliyevin hər iki çıxışına nəzər saldıqda məlum olur ki, o, istər sovetlər dövründə, istərsə də müstəqillik dövründə hakimiyyətdə olduğu zaman Azərbaycanın tarixi məsələlərinə ciddi şəkildə yanaşmış və bunu digərlərindən də tələb etmişdir.

**2.Tarixi əsərlərə verdiyi dəyər**

Sovetlər dövründə Azərbaycan tarixinin müəyyən qədər tədqiq edilən dövrü orta əsrlər dövrü olmuşdur. Lakin buna baxmayaraq tədqiqat əsərlərində bir çox hallarda tarixi həqiqətlər ört-basdır edilirdi. Bunları nəzərə alan Heydər Əliyev qətiyyətlə Azərbaycan tarixinin orta əsrlər dövrünün araşdırılmasını, orta əsrlərə aid tarixi abidələrimizin qorunmasını və sonrakı nəsillərə çatdırılmasını ən vacib məsələlərdən biri olaraq vurğulayırdı. Heydər Əliyevin sözləri ilə desək müstəqillik əldə edən dövlət, müstəqil siyasət aparmaq istəyirsə ilk növbədə öz tarixindən xəbərdar olmalıdır. Bunu orta əsrlərdə mövcud olan Azərbaycan dövlətləri də sübut edir. Misal olaraq, Azərbaycan Ağqoyunlu dövlətinin hökmdarı Uzun Həsənin yürütdüyü siyasəti qeyd edə bilərik. Tarixi biliklərin daha geniş şəkildə araşdırılması üçün Uzun Həsən Avropa dövlətləri ilə diplomatik əlaqələr qurmuş və bu ölkələrə heyətlər göndərməklə yanaşı qonaqlar da qəbul etmişdir [Əliyev 1997, 1-ci kitab, s.180].

Heydər Əliyevin söylədiyi nitqdən bir daha aydın olur ki, Azərbaycanın orta əsrlər tarixi xüsusi əhəmiyyətə malikdir. Azərbaycanın orta əsrlər tarixini öyrənmək üçün əsas mənbələrdən biri “Kitabi-Dədə Qorqud” dastanıdır. Oğuz türklərinin tərcümeyi-halından bəhs olunan “Kitabi-Dədə Qorqud”da, azərbaycanlıların etnogenez məsələsi, soykökü, dili, adət-ənənələri, qonşu etnoslarla münasibətləri, dini və milli-mənəvi dəyərləri haqqında ətraflı məlumatlar verilməkdədir. “Kitabi-Dədə Qorqud” dastanı

Azərbaycanın tarixi keçmişinə aid ilkin yazılı mənbələrdən biridir. Mənbədə orta əsrlər tarximizlə bağlı mühüm məlumatlar mövcuddur. "Kitabi-Dədə Qorqud" dastanında yer alan boylardan əldə etdiyimiz məlumatlar aydın şəkildə şimallı cənublu Azərbaycanda, Şərqi Anadoluda, Borçalıda və Qərbi Azərbaycanda (indiki Ermənistan) qədim dövrlərdən türklərin yaşadıqlarını sübut edir [Ağayev 2016, s.25-29]. "Kitabi-Dədə Qorqud" Bab əl-Əbvabdan Diyarbəkrə, Mardinə, Xəzərdən Qaradəniz sahillərinədək, Ön Asiyada və Cənubi Qafqaz kimi geniş bir ərazidə yaşayan və türk dilində danışan Azərbaycan xalqının tarixi abidəsi hesab olunur.

Heydər Əliyevin hakimiyyətdə olduğu dövrdə gördüyü ən mühüm işlərdən biri "Kitabi-Dədə Qorqud" əsərinə göstərdiyi diqqət və qayğı olmuşdur. Məhz onun 1997-ci il aprelin 20-də imzaladığı fərmanla "Kitabi-Dədə Qorqud" dastanının 1300 illiyi qeyd olunmuşdur. Ulu Öndərin verdiyi tarixi fərmanda belə deyilir:

> "... "Kitabi-Dədə Qorqud" dastanının dünya mədəniyyəti və ədəbiyyatı tarixində xüsusi yer tutduğunu, onun Azərbaycan xalqının, bütün türk xalqlarının qədim və zəngin mədəniyyətinin təbliğinə xidmət edən beynəlxalq əhəmiyyətli hadisə olduğunu nəzərə alaraq, Azərbaycan xalqının bu möhtəşəm epik əsərinin 1300 illik yubileyinin layiqincə hazırlanması və keçirilməsi məqsədi ilə qərara alıram..." [Heydər Əliyev və Azərbaycan xalq mədəniyyəti 2023, s.16].

Heydər Əliyevin verdiyi bu tarixi qərarla sovetlər dövründə uzun müddət pantürkizm damğası vurularaq qadağan olunmuş "Kitabi-Dədə Qorqud" dastanı yenidən azərbaycanlıların istinad etdiyi əsas mənbələrdən birinə çevrilmişdir.

"Kitabi-Dədə Qorqud" dastanının 1300 illiyinin keçirilməsi ilə bağlı imzalanan fərman və yaradılan dövlət komissiyasının iclas materialları ilə tanış olduqda məlum olur ki, Heydər Əliyev keçirilən tədbirin ən kiçik detalları ilə belə maraqlanaraq bütün işlərə özü rəhbərlik etmişdir. "Kitabi-Dədə Qorqud" dastanının 1300 illiyinin keçirilməsində qarşıya qoyulan əsas məqsədlər aşağıdakılardan ibarət idi:

1. "Kitabi-Dədə Qorqud" dastanını azərbaycanlılara olduğu kimi tanıtmaq;
2. "Kitabi-Dədə Qorqud" dastanını dünyaya tanıtmaq;
3. "Kitabi-Dədə Qorqud" dastanının Azərbaycana və türk dünyasına məxsus olduğunu təsdiq etmək [Hüseynova 2011, s.45].

Azərbaycan alimləri də daxil olmaqla türkoloqların əksəriyyəti "Kitabi-Dədə Qorqudu" daha çox ədəbi yöndən araşdırmağa cəhd etmişlər. Amma əsəri tədqiq etdiyimiz zaman burada tarixi hadisələrin daha çox olduğunun şahidi oluruq. Akademik Yaqub Mahmudov "Dədə Qorqud kitabı" – xalqın

yaratdığı və yaşatdığı tarix” adlı məqaləsində bu barədə ətraflı məlumat vermişdir [Mahmudov 2004, s.18-35].

“Kitabi-Dədə Qorqud” dastanının 1300 illik yubileyinin keçirilməsi ilə Heydər Əliyev irsində Azərbaycan tarixinin orta əsrlər dövrünün tədqiqi məsələsi zirvəyə çatmışdır. Nəticədə uzun illər davam edən etinasızlığa son qoyulmuşdur.

Heydər Əliyev irsində təkcə orta əsr mənbələri deyil, eyni zamanda orta əsrlər dövründə yaşamış azərbaycanlı şəxsiyyətlərə də xüsusi önəm verilirdi. Bu şəxsiyyətlərdən Cavanşiri, Babəki, Məhəmməd Cahan Pəhləvanı, Qızıl Arslanı, Uzun Həsəni, Şah İsmayıl Xətaini və s. qeyd edə bilərik. Tarixi məsələlərdən danışan Heydər Əliyev, mütləq şəkildə bu şəxsiyyətlərdən hər hansı birinin adını qeyd edirdi. Gənclərlə görüş zamanı onların qarşısında uzun nitq söyləyən Heydər Əliyev, məhz orta əsrlər tarixinə müraciət edərək onlara Uzun Həsəni nümunə göstərmiş, bununla da Azərbaycan diplomatiyasının qədim tarixə malik olduğunu qeyd etmişdir. Gənclərin qarşısında Uzun Həsənin adını vüqarla qeyd edən Heydər Əliyev, hər bir azərbaycanlı gəncinin onun kimi bacarıqlı bir hökmdar, siyasətçi, diplomat və şücaətli bir şəxsiyyət olmasını arzulamışdır.

Müraciətlərinin birində dövlətçilik tariximizə, qəhrəmanlıq tariximizə, milli-mənəvi dəyərlərimizə, tarixi şəxsiyyətlərimizə, tariximizin dövrləşdirilməsi məsələlərinə, tarix boyu Azərbaycan ərazisində mövcud olan dini məsələlərə diqqət ayıran Heydər Əliyev belə demişdir:

> “Cavanşir və Babək kimi sərkərdələrin göstərdiyi qəhrəmanlıqlar vətənpərvərlik məktəbinə çevrilmiş, vətənin bütövlüyü, xalqın birliyinin təcəssümü olmuşdur. Məhəmməd Cahan Pəhləvanın, Qızıl Arslanın, Uzun Həsənin, Şah İsmayıl Xətainin və digər dövlət xadimlərimizin həyat və fəaliyyəti xalqın vətən sevgisinə dövlətçilik hissini daha da inkişaf etdirmiş, onu həyatın ən vacib, ən ümdə məqsədinə çevirmişdir” [Əliyev 2010, s.283].

**3.Tarixi şəxsiyyətlərə verdiyi dəyər**

Azərbaycan tarixinin orta əsrlər dövrünə xüsusi diqqət və qayğı ilə yanaşın Heydər Əliyev, bu dövrdə yaşayıb-yaratmış azərbaycanlı ədib və şairlərin də adlarını qeyd etməyi unutmurdu. Bu məsələlər barəsində çıxış edən Heydər Əliyev belə demişdur:

> “Xalqımızın əsrlər boyu yaratdığı mədəniyyət və ədəbiyyat nümunələri həyat eşqi, azadlıq və müstəqillik duyğuları ilə aşılanmışdır. Dastanlarımız kimi möhtəşəm sənət abidələri, dünya sivilizasiya tarixində silinməz izlər qoymuş Qətran Təbrizi, İmadəddin Nəsimi, Məhəmməd Füzuli kimi korifeylərin yaradıcılığı ümumbəşəri ideyaların tərənnümünə, haqqın, ədalətin, humanist ideyaların bərqərar olmasına

xidmət etmişdir. Səfiəddin Urməvinin, Əcəmi Naxçıvaninin, Sultan Məhəmməd Təbrizinin dünya mədəniyyəti xəzinəsinə verdikləri incilər sənətsevərləri indi də heyran qoyur...

Şərqdə, o cümlədən Azərbaycanda təşəkkül tapmış intibah dünya mədəniyyəti tarixinin ən parlaq səhifələrindən biridir. Bu intibah Azərbaycan xalqının həyatın müxtəlif sahələrində qazandığı böyük uğurlarının məntiqi nəticəsi idi" [Əliyev 2010, s.283; Hüseynova 2011, s.48].

1999-cu ilin oktyabr ayında Naxçıvana səfər edən Heydər Əliyev yenə də həmişə olduğu kimi orta əsr abidələrindən olan Möminə Xatun türbəsini ziyarət etmiş və bu türbənin tarixindən geniş şəkildə danışmışdır. Bu nitqində orta əsrlərdə mövcud olmuş Azərbaycan Atabəylər dövlətinin və bu dövrün tədqiqatçısı olan Ziya Bünyadovun xidmətlərini xüsusilə vurğulayan Heydər Əliyev dörd əsas məqamı insanların diqqətə almasını vacib bilmişdir:

1. Atabəylər dövlətinin Azərbaycanın orta əsrlər tarixindəki rolunu və yerini;
2. Möminə Xatun türbəsinin Naxçıvan memarlıq məktəbinin simvoluna çevrilməsini;
3. Tarixi abidələrin simasında orta əsr dövlətlərinin qüdrətinin təcəssüm olunmasını;
4. Tarixi abidələrin bərpası, qorunması ilə yanaşı onların sonrakı nəsillərə çatdırılmasının vacibliyini [Hüseynova 2011, s.53-54].

**4.Tarixi-dini abidələrə verdiyi dəyər**

Azərbaycanın tarixi, dini və mədəni abidələrinin hərtərəfli tədqiqində, zəngin mədəni və mənəvi irsinin dünyaya çatdırılmasında Ulu Öndərin əvəzsiz xidmətləri olmuşdur. Onun bu xidmətləri respublikanın gələcək maddi-mənəvi, ictimai-siyasi və tarixi-dini həyatı üçün örnək və mədəni irsə münasibəti baxımından mühüm əhəmiyyətə malik idi [Metafizika 2023, s.133].

Qeyd etdiklərimizdən məlum olur ki, Azərbaycanda tarix boyu mövcud olan tarixi abidələrin bərpası və qorunaraq sonrakı nəsillərə çatdırılması ulu öndər Heydər Əliyevin irsində ən mühüm məsələlərdən biri olmuşdur. Müstəqillikdən əvvəl sovetlər dövründə də bu tarixi ənənəyə sadiq qalan Heydər Əliyevin təşəbbüsü ilə 1977-ci ildə tarixi-memarlıq qoruğuna çevrilən İçərişəhər, səkkiz il sonra 1985-ci ildə yenə də onun təşəbbüsü ilə Dövlət Tarix-Memarlıq Qoruğu olaraq elan edilmişdir. Müstəqilliyimizin bərpa olunmasından və Heydər Əliyevin hakimiyyətə gəlişindən sonra da bu kimi məsələlər ön sırada olmuşdur. Hakimiyyətdə olduğu dövrdə Azərbaycanda mövcud olan orta əsr abidələrinin qorunmasına xüsusi qayğı

ilə yanaşan Heydər Əliyev, 1998-ci ilin aprelində “Tarix və mədəniyyət abidələrinin qorunması haqqında” qanunun qəbul olunmasına nail olmuşdur.

2003-cü ilin fevralında isə Heydər Əliyev “*Bakı şəhərində İçərişəhər Tarix-memarlıq Qoruğunun mühafizəsi və bərpası ilə bağlı bəzi tədbirlər haqqında*” sərəncam imzalamışdır. Bu sərəncam da digərləri kimi orta əsr abidələrimizin qorunmasına və bərpasına xidmət edirdi. Orta əsr şəhərlərindən olan Bakı və Bakıda mövcud olan abidələr Azərbaycan orta əsrlər dövrünün canlı şahididir. Sərəncamda deyilir: *“Azərbaycanın paytaxtı Bakı şəhərinin zəngin tarixi vardır. Əcdadlarımızın bizə yadigar qoyduğu bu gözəl şəhərin hər bir guşəsi, hər bir daşı Azərbaycan xalqının yüksək dühasını, böyük qüdrətini, ulu mədəniyyətini əyani şəkildə nümayiş etdirir. Memarlıq tariximizin daş ensiklopediyası olan Bakı Azərbaycanın hər bir bölgəsində inşa edilmiş qədim tikililərlə qırılmaz tellərlə bağlıdır... Bakı şəhərinin memarlıq abidələri artıq bizim milli mədəniyyətimizin və tariximizin rəmzlərinə çevrilmişdir...*

*Bakının ən qədim, vaxtilə bütövlükdə qala divarları ilə əhatə olunmuş hissəsi heç şübhəsiz ki, İçərişəhərdir. Orada bu günə qədər qorunub saxlanılmış müdafiə, dini ibadət, ictimai və siyasi xarakterli bir sıra tikililərin mövcudluğu xalqımızın mədəniyyət tarixində mühüm yer tutan memarlıq məktəblərinin yüksək peşəkarlıq səviyyəsindən xəbər verir. Öz adlarını İçərişəhərin daş kitabələri üzərində həkk etmiş qədim Azərbaycan memarları və sənətkarlarının zəkası və zəhməti ilə açıq səma altında yaradılmış bu “muzey-şəhər” hər bir azərbaycanlının qəlbində sonsuz qürur hissi doğurur. İçərişəhər Azərbaycan xalqının milli sənəti, milli iftixarıdır.*

*İçərişəhər orta əsrlərdə Azərbaycanda yüksək inkişaf etmiş şəhərsalma sənətinin olduqca qiymətli incisidir. Onun ərazisində yerləşən Qız qalası, qala divarları, Şirvanşahlar sarayı, məscidlər, karvansara, hamam, bazar meydanı və sair tikililər Azərbaycan memarlıq sənətinin keçdiyi ayrı-ayrı mərhələləri əyani şəkildə özündə təcəssüm etdirən abidələrdir...*

*...XV əsrdə Bakının Şirvanşahlar dövlətinin paytaxtına çevrilməsi ilə əlaqədar olaraq tikilmiş Şirvanşahlar sarayı İçərişəhərin simasına xüsusi bir yaraşıq və əzəmət vermişdir...”* [Azərbaycan qəzeti 2003].

Nitqinin sonunda İçərişəhərdə aparılan qanunsuz tikililərə və bu tikililər vasitəsilə tarixi binalar üçün yaradılan təhlükələrə toxunan Heydər Əliyev, bu işdə Bakı Şəhər İcra Hakimiyyətinin keçmiş rəhbərliyini, Azərbaycan Respublikasının Mədəniyyət Nazirliyini və əvvəllər bu kimi işlərə cavabdehlik daşıyan Tarix və Mədəniyyət Abidələrinin Mühafizəsi və Bərpası Komitəsini qınaq obyektinə çevirmişdir [Hüseynova 2011, s.56].

Sərəncamla əlaqədar olaraq bütün dövlət qurumlarına verilən tapşırıqlar əsasında Azərbaycanda mövcud olan tarixi abidələrin bərpası işləri davamlı olaraq inkişaf etdirilmişdir.

2000-ci ilin aprelində təşkil edilən Azərbaycan memarlarının XVI qurultayında iştirak edən Heydər Əliyev, geniş nitq söyləyərək memarlara Azərbaycanda mövcud olan orta əsr abidələrinin bərpasını xüsusi şəkildə tövsiyə etmişdir [Əliyev 2009, s.350].

Heydər Əliyev irsində əsas yer tutan orta əsr abidələrinin bərpası və qorunması işləri ondan sonra da eyni qaydada davam etdirilməkdədir. 06 dekabr 2005-ci ildə Naxçıvan Muxtar Respublikası Ali Məclisi sədrinin imzaladığı "*Naxçıvan Muxtar Respublikası ərazisindəki tarix və mədəniyyət abidlərinin qorunması və pasportlaşdırılması işinin təşkili*" haqqında sərəncamda deyilirdi: "Naxçıvan Muxtar Respublikası zəngin tarixə malikdir. Burada əldə olunan maddi mədəniyyət nümunələri Naxçıvan ərazisində qədim daş dövründən başlayaraq bu yurdun ilkin sivilizasiyalı yaşayış məskənlərindən biri olduğunu sübut edir".

Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyev demişdir: *"Naxçıvan Azərbaycan xalqının tarixini əks etdirən abidələri özündə cəmləşdirən bir diyardır..."* [Hüseynova 2011, s.57].

Bildiyimiz kimi Azərbaycanın orta əsr paytaxt şəhərlərindən olan Naxçıvan da memarlıq abidələri ilə zəngin ərazilərdən biridir. XII əsrdə Azərbaycan Atabəylər dövlətinin paytaxtı olan Naxçıvan siyasi, iqtisadi, mədəniyyət və sənətkarlıq baxımından inkişaf etmişdir. Bu dövrdə inkişaf edən Azərbaycan memarlığı yüksək səviyyəyə çatmışdır. Bu dövrün memarlıq üslubu sonralar "*Naxçıvan memarlıq məktəbi*" kimi tanınmışdır. Əcəmi Əbu Bəkr oğlu Naxçıvani, Əmirəddin Məsud Naxçıvani və Əhməd ibn Əyyub əl-Hafiz Naxçıvani kimi memarlar "Naxçıvan memarlıq məktəbi"nin yetirmələrindən hesab olunurlar. Atabəylər dövrünün məşhur memarlarından olan Əcəmi Naxçıvaninin inşa etdiyi Yusif ibn Kuseyr və Möminə Xatun türbələri indi də öz əzəmətini qoruyub saxlamaqdadır. Bunlardan əlavə Gülüstan türbəsini (XII-XIII əsrlər), Qarabağlar memarlıq kompleksini (XIII-XIV əsrlər), Xanəgah (XIII-XV) abidələrini qeyd edə bilərik. Naxçıvana səfər edən Övliya Çələbi, Tavarye, Şarden, Moryer kimi Şərq və Avropa tarixçiləri də Naxçıvanda mövcud olan tarixi abidələr haqqında geniş məlumat verməkdədirlər.

Sovetlər dövründə Azərbaycanın digər ərazilərində olduğu kimi Naxçıvanda da mövcud olan tarixi abidələrə xoş münasibət göstərilmir, heç bir səbəb olmadan bu abidələrin məhv edilməsinə çalışılırdı.

Heydər Əliyevin hakimiyyətə gəlişindən sonra Naxçıvanda mövcud olan orta əsr tarixi abidələrin bərpasına diqqət edilmiş və onun göstərişi ilə

Azərbaycan Milli Elmlər Akademiyası Naxçıvan bölməsi təşkil edilmişdir. Naxçıvan bölməsinin yaradılması burada mövcud olan tarixi abidələrə göstərilən dövlət qayğısını bir daha sübut edir.

Heydər Əliyevin verdiyi sərəncamlar, göstərdiyi diqqət və qayğı nəticəsində Naxçıvanda mövcud olan orta əsr abidələri yenidən təmir və bərpa olunmağa başlamışdır. Yusif ibn Küseyr və Möminə xatun türbələri, Qarabağlar kompleksi, Əshabi-Kəhf, İmamzadə, Buzxana abidələri, Bazarçaydakı yeraltı abidə, Şərq hamamı, Xan evi, Ordubaddakı Aza körpüsü, qədim Zorxana abidəsi və Culfadakı Xanəgah kompleksi məhz Heydər Əliyevin göstərişi və rəhbərliyi ilə əsaslı şəkildə təmir-bərpa edilmişdir [Ağalarov 2016, s.43-52; Şərifov 2017, s.32-35; Naxçıvan Muxtar Respublikası ərazisindəki tarix və mədəniyyət abidələrinin qorunması və pasportlaşdırılması işinin təşkili” haqqında sərəncam 2005].

Qeyd etdiklərimizdən bir daha aydın olur ki, orta əsrlərdə Azərbaycanda mövcud olmuş tarixi abidələrin bərpası, bu dövrdə yaşayıb-yaratmış tarixi şəxsiyyətlərin yaradıcılığının tədqiqi və təbliği Heydər Əliyev irsində xüsusi yer tutmuşdur.

Tariximizə, milli-mənəvi dəyərlərimizə qarşı bəslənilən yad münasibətlərlə mübarizə aparan Heydər Əliyev, bunu həm sözlərində, həm də əməllərində sübut etməyə çalışırdı. Orta əsrlərdə yaşayan azərbaycanlı ədiblərin yaradıcılığına xüsusi diqqətlə yanaşan Heydər Əliyev, dahi Nizami Gəncəvi, Məhəmməd Füzuli, Xaqani Şirvani, Fələki Şirvani və Məhsəti Gəncəvinin adlarını xüsusilə qeyd edirdi. Məhz onun təşəbbüsü ilə Nizami Gəncəvinin 840, 850 illiyi, İmadəddin Nəsiminin 600 illiyi qeyd olunmuşdur. Hətta böyük çətinliklər bahasına olsa da Nizaminin əsərləri Moskvada nəşr edilmişdir [Hüseynova 2011, s.60-61]. 1994-cü ildə Türkiyənin Ankara şəhərində Məhəmməd Füzulinin 500 illik yubileyinə həsr olunmuş tədbirdə çıxış edən Heydər Əliyev belə demişdir: *“Çoxəsrlik tarixi ərzində böyük sınaqlardan keçmiş Azərbaycan xalqı, mənəviyyatını, dinini yaratmış və qoruyaraq bu günə çatdırmışdır. Dünya mədəniyyətinə böyük şəxsiyyətlər bəxş etmiş xalqımız, dünya sivilizasiyasını elm, mədəniyyət sahəsində dəyərli əsərlərlə zənginləşdirmişdir”* [Əliyev 1997, 2-ci kitab, s.85; Hüseynova 2011, s.64].

Tarixi abidələrimizlə yanaşı, dini abidələrimizin də qorunması və bərpa olunması Heydər Əliyevin diqqət mərkəzində olmuşdur. Bu sahədə böyük işlər görən və xalqı da bu işləri görməyə həvəsləndirən Heydər Əliyev, 1998-ci il iyul ayının 12-də Bibiheybət məscidinin açılışı zamanı xalqa belə müraciət etmişdir: *“Bu gün - bizim üçün əziz olan bu bayram günü Azərbaycan Respublikasının, məmləkətinin, xalqının həyatında tarixi hadisə baş verir. Biz bu gün XIII əsrdə - 700 il bundan əvvəl müqəddəsliyə*

*çevrilmiş bu yerdə toplaşmışıq. Bu müqəddəs yer həzrəti İmam Museyi-Kazimin qızı, həzrəti İmam Rzanın bacısı həzrəti Hökümənin torpağa verildiyi, onun məzarı olan yerdir. Bu yer o vaxtdan indiyə qədər müsəlmanlar üçün müqəddəs bir yerə çevrilmişdir. Müsəlmanlar bu yeri əsrlər boyu ziyarət etmiş, burada özlərinə ümid, pənah axtarmışlar, dinimizə, Allaha, peyğəmbərə dua etmişlər, özlərini yaşatmışlar, İslam dininə sadiq olduqlarını nümayiş etdirmişlər. Biz fəxr edirik ki, İslam aləmində İslamı təmsil edən müqəddəs yerlərdən Azərbaycanda da vardır...*

*...İslam dininin dəyərləri ən yüksək mahiyyətə malik olan mənəvi dəyərlərdir. Bu dəyərləri yaşatmaq, insanları bu uca, yüksək mənəvi dəyərlər səviyyəsində tərbiyə etmək Allahın buyruğudur, Məhəmməd Peyğəmbərin qoyduğu bir yoldur. Mən böyük iftixar hissi ilə deyirəm ki, Azərbaycan xalqı bütün çətinliklərdən, bəlalardan, məhrumiyyətlərdən, zillətlərdən keçərək öz dininə, mənəvi dəyərlərinə daim sadiq olmuşdur və heç bir hakimiyyət, hökmdar bunların məhv edilməsinə nail ola bilməmişdir. Burada, bu müqəddəs yerdə vaxtilə ucaldılmış məscid 60 il bundan əvvəl vəhşicəsinə dağıdılmışdır. Bizim mənəviyyatımıza, mənəvi dəyərləmizə, İslam dininə böyük zərbə vurulmuşdur. Bütün bunlara dözərək məğlub olmayan xalqımız, bu müqəddəs yerdən heç vaxt ayrılmamışdır...*

*Bunlar hamısı Azərbaycan xalqının tarixidir. Bizim böyük və qədim tariximizin şanlı, şöhrətli, uğurlu səhifələri ilə yanaşı, faciəvi səhifələri də vardır. Bunlar hamısı bizimdir...*

*...Bizim mənəvi, islami dəyərlərimiz nəsillərdən-nəsillərə keçib, yaşayıb, gəlib bu günlərə çatıb. Bunlar bu gün də xalqımızın, millətimizin ən böyük mənəvi sərvətidir”* [Əliyev 2005, s.229].

VII əsrin ortalarında Azərbaycan ərazisində yayılmağa başlayan İslam dini, xalqın formalaşmasında, yerli əhali ilə qaynayıb-qarışmaqda olan qeyri-türk etnoslarının qəsbkarlara qarşı birləşməsində böyük rol oynamışdır. İslam dininin gəlişindən sonra əhalinin qaynayıb-qarışması, qohumlaşması etnik-siyasi birliyin də inkişaf edərək möhkəmlənməsinə şərait yaratmışdır.

09 dekabr 1996-cı ildə Təzəpir məscidində keçirilən Məbəs bayramında iştirak edən Heydər Əliyev geniş nitq söyləyərək belə demişdir: *“Son illər Azərbaycan xalqının başına bəlkə indiyə qədər görünməmiş misilsiz bir bəla gəlmişdir. O da Ermənistanın Azərbaycana qarşı səkkiz il bundan əvvəl başladığı hərbi təcavüzdür. Bu təcavüz nəticəsində, məhz bizim içimizdə olan ayrı-ayrı qüvvələrin məsləkimizə, mənəviyyatımıza və milli dəyərlərimizə, ruhumuza xəyanət etdiklərinə görə biz itkilər vermişik, böyük çətinliklərlə qarşılaşmışıq, torpaqlarımızın bir qismi işğal olunubdur,*

*qəsbkar Ermənistan silahlı qüvvələrinin tapdağı altındadır. İşğal atında olan torpaqlarda tarixi-dini abidələrimiz viran edilibdir...*

*...Biz dinimizin bütün qanunlarına sadiqik. Amma eyni zamanda, İslam dini başqa dinlərə heç vaxt düşmənçilik göstərməmiş və göstərmir. Ona görə də biz bu milli, mənəvi dəyərləmizə əsaslanaraq məsələlərin sülh yolu ilə həll edilməsinə çalışırıq”* [Əliyev 1998, s.156].

**5.Nəticə**

Beləliklə, Heydər Əliyev irsində orta əsrlərə aid tarixi-dini abidələrimizin qorunması və bərpası, milli-mənəvi dəyərlərimizin formalaşması, bu dövrün ədiblərinin həyatının işıqlandırılması və əsərlərinin nəşr edilərək sonrakı nəsillərə çatdırılması əsas yer tutmuşdur. Ulu öndərin irsində öz əksini tapmış Azərbaycanın orta əsrlər tarixinin əsas məqamları bunlardan ibarət olmuşdur:

1. Azərbaycanın orta əsrlər tarixinin fərqli məsələlərinin özünəməxsus şəkildə qiymətləndirilməsi;
2. Orta əsr tarixi abidələrlə yanaşı, dini abidələrin bərpası və qorunaraq sonrakı nəsillərə çatdırılması;
3. Orta əsr mənbələrindən olan “*Kitabi-Dədə Qorqud*” dastanının 1300 illiyinin qeyd olunaraq onun olduğu kimi insanlara təbliğ olunması;
4. Tarixi abidələrlə yanaşı, tarixi şəxsiyyətlərin də həyatının və əsərlərinin düzgün şəkildə öyrənilərək qiymətləndirilməsi;
5. Bütün bunlarla yanaşı tarix boyu formalaşmış milli və mənəvi dəyərlərimizin inkişaf etdirilərək qorunması və sonrakı nəsillərə çatdırılması.

Qeyd etdiyimiz bu prinsiplərə xüsusi diqqət və qayğı ilə yanaşan Heydər Əliyev, digərlərindən də bunu tələb etmişdir.

## ƏDƏBİYYAT

**1.** Ağalarov, M. (2016). Şərqi Anadolu və Naxçıvan Bölgəsinin Tarixi və Memarlıq Abidələrinin Turistik Açıdan Təbliği (XV-XVII əsr Səyyah və Coğrafiyaşünasların Əsərləri Əsasında). Kastamonu: *Uluslararası Türk Dünyası Turizm Araştırmaları Dergisi, cilt:1, No:1.*

**2.** Ağayev, R. (2016). Azərbaycan türklərinin etnik tarixinin öyrənilməsində “Kitabi-Dədə Qorqud”un rolu. *Geostrategiya jurnalı, №4.*

**3.** *“Azərbaycan qəzeti”,* 18 aprel, 2003-cü il.

**4.** Əliyev, H. (1997). *Müstəqilliyimiz əbədidir. 1-ci kitab.* Çıxışlar, nitqlər, bəyanatlar, müsahibələr, məktublar, məruzələr, müraciətlər, fərmanlar. Bakı: Azərnəşr.

**5.** Əliyev, H. (1997). *Müstəqilliyimiz əbədidir. 2-ci kitab.* Çıxışlar, nitqlər, bəyanatlar, müsahibələr, məktublar, məruzələr, müraciətlər, fərmanlar. Bakı: Azərnəşr.
**6.** Əliyev, H. (1998). *Müstəqilliyimiz əbədidir. 8-ci kitab.* Çıxışlar, nitqlər, bəyanatlar, müsahibələr, məktublar, məruzələr, müraciətlər, fərmanlar. Bakı: Azərnəşr.
**7.** Əliyev, H. (2005). *Müstəqilliyimiz əbədidir. 16-cı kitab.* Çıxışlar, nitqlər, bəyanatlar, müsahibələr, məktublar, məruzələr, müraciətlər, fərmanlar. Bakı: Azərnəşr.
**8.** Əliyev, H. (2009). *Müstəqilliyimiz əbədidir. 26-cı kitab.* Çıxışlar, nitqlər, bəyanatlar, müsahibələr, məktublar, məruzələr, müraciətlər, fərmanlar. Bakı: Azərnəşr.
**9.** Əliyev, H. (2010). *Müstəqilliyimiz əbədidir. 31-ci kitab.* Çıxışlar, nitqlər, bəyanatlar, müsahibələr, məktublar, məruzələr, müraciətlər, fərmanlar. Bakı: Azərnəşr.
**10.** *Heydər Əliyev və Azərbaycan xalq mədəniyyəti.* (2023). Bakı: Elm və təhsil, 324 s.
**11.** Hüseynova, L. (2011). *Heydər Əliyev irsində Azərbaycan tarixi məsələləri*. Bakı: Təhsil.
**12.** Mahmudov, Y. (2004). *"Dədə Qorqud kitabı" – xalqın yaratdığı və yaşatdığı tarix*. Bakı: Öndər nəşriyyatı.
**13.** Ağalarzadə, A., & Kərimov, S. (2023). Azərbaycanın maddi-mədəni irsinin qorunmasında Heydər Əliyevin rolu. *"Metafizika" jurnalı, 6(1),* səh.132-138.
**14.** *Naxçıvan Muxtar Respublikası ərazisindəki tarix və mədəniyyət abidələrinin qorunması və pasportlaşdırılması işinin təşkili" haqqında sərəncam.* Naxçıvan şəhəri, 6 dekabr 2005-ci il №5-03. Beynəlxalq Elektron kitabxana-Heydər Əliyev irsini araşdırma mərkəzi. www.aliyevheritage.org.
**15.** Şərifov, Ş. (2017). Naxçıvan şəhəri və onun xilafət tərəfindən fəthi. Bakı: *Geostrategiya, № 03 (39).*

# Средневековые исторические проблемы Азербайджана в наследии Гейдара Алиева

**Шахлар Шарифов***

**Абстракт.** Незабываемые заслуги общенационального лидера Гейдара Алиева в защите национальных и культурных ценностей служили сохранению материальной и духовной культуры. Воздвижение памятников, посвященных историческим деятелям, охрана исторических и культурных памятников, празднование юбилеев личностей, известных на международном уровне, издание указов о депортациях и геноцидах и ряд других важных событий связано с именем этой великой личности.

Благодаря научным высказываниям Гейдара Алиева, как в советский период, так и в период независимости мировая общественность осведомилась о древней культуре азербайджанского народа. Наряду с этим выявление и сохранение информации о средневековых исторических, религиозных памятниках, а также письменных источниках и исторических личностях также являлось основной задачей незабываемого лидера.

**Ключевые слова:** Гейдар Алиев, Азербайджан, Китаби-Дада Горгуд, Атабеки, Ичери -шехер, мавзолей Юсуфа бин Кусейра, мавзолей Момине Хатун, мечеть Биби-Эйбат, мечеть Тезепир

* Доктор философии по теологии, доцент,
Ведущий научный сотрудник отдела “Истории Азербайджана VII-XIV вв.” Института Истории им.А.А.Бакиханова НАНА; Баку, Азербайджан
E-mail: shahlarsharifov@gmail.com
https://orcid.org/0000-0002-0395-5174

**Цитировать статью:** Шарифов, Ш. [2023]. Средневековые исторические проблемы Азербайджана в наследии Гейдара Алиева. *Журнал «Metafizika». 6(4),* с.83-97.

**История статьи:**
*Статья поступила в редакцию: 18.09.2023*
*Отправлена на доработку: 16.10.2023*
*Принята для печати: 01.12.2023*

## Medieval Issues of the History of Azerbaijan in the Legacy of Heydar Aliyev

**Shahlar Sharifov***

**Abstract.** Heydar Aliyev, who did invaluable services in the protection of our historical, national and moral values, has always taken special care of our material and spiritual culture and tried to protect it. The monuments erected in honor of our historical figures, the protection of our historical and cultural monuments and the celebration of the anniversaries of well-known personalities at the international level, the issuance of decrees on deportations and genocides are connected with the name of the great leader Heydar Aliyev.

The personality of Heydar Aliyev tried to declare to the whole world that the Azerbaijani people are a people with an ancient culture, both during the Soviet era and during the period of independence. He tried to prove this by preserving the historical and religious monuments that existed in Azerbaijan in the middle ages and passing them on to the next generations. It included medieval sources and our historical figures who lived in this period too.

**Keywords:** Heydar Aliyev, Azerbaijan, Kitabi-Dada Gorgud, Atabayler, Icherisheher, Mausoleum of Yusif ibn Kuseyir, Mausoleum of Momina Khatun, Bibi-Heybat mosque, Taza Pir mosque

### REFERENCES

1. Agalarov, M. (2016). Promotion of Historical and Architectural Monuments of Eastern Anatolia and Nakhchivan Region from the Tourist Point of View (Based on the Works of Travelers and Geographers of the XV-XVII centuries). Kastamonu: *International Turkish World Tourism Research Journal, volume:1, No:1.* (in Azerbaijani)
2. Agayev, R. (2016). The role of “Kitabi-Dada Gorgud” in the study of ethnic history of Azerbaijani Turks. *Journal of Geostrategy, 4.* (in Azerbaijani)
3. *“Azerbaijan newspaper”,* April 18, 2003. (in Azerbaijani)

---

* Doctor of Philosophy in Theology, Associate Professor,
Leading researcher of the department “History of Azerbaijan in the 7th-14th centuries.” Institute of History named after A.A. Bakikhanov of ANAS; Baku, Azerbaijan
E-mail: shahlarsharifov@gmail.com
https://orcid.org/0000-0002-0395-5174

**To cite this article:** Sharifov, Sh. [2023]. Medieval issues of the history of Azerbaijan in the legacy of Heydar Aliyev. *“Metafizika” journal. 6(4),* pp.83-97.

**Article history:**
*Received: 18.09.2023*
*Accepted: 01.12.2023*

**4.** Aliyev, H. (1997). *Our independence is eternal. 1st book.* Speeches, speeches, statements, interviews, letters, reports, appeals, decrees. Baku: Azernashr. (in Azerbaijani)
**5.** Aliyev, H. (1997). *Our independence is eternal. 2nd book.* Speeches, speeches, statements, interviews, letters, reports, appeals, decrees. Baku: Azernashr. (in Azerbaijani)
**6.** Aliyev, H. (1998). *Our independence is eternal. 8th book.* Speeches, speeches, statements, interviews, letters, reports, appeals, decrees. Baku: Azernashr. (in Azerbaijani)
**7.** Aliyev, H. (2005). *Our independence is eternal. 16th book.* Speeches, speeches, statements, interviews, letters, reports, appeals, decrees. Baku: Azernashr. (in Azerbaijani)
**8.** Aliyev, H. (2009). *Our independence is eternal. 26th book.* Speeches, speeches, statements, interviews, letters, reports, appeals, decrees. Baku: Azernashr. (in Azerbaijani)
**9.** Aliyev, H. (2010). *Our independence is eternal. 31th book.* Speeches, speeches, statements, interviews, letters, reports, appeals, decrees. Baku: Azernashr. (in Azerbaijani)
**10.** *Heydar Aliyev and Azerbaijani folk culture.* (2023). Baku: Science and Education, 324 p. (in Azerbaijani)
**11.** Huseynova, L. (2011). *Historical issues of Azerbaijan in the legacy of Heydar Aliyev*. Baku: Education. (in Azerbaijani)
**12.** Mahmudov, Y. (2004). *“The book of Grandfather Gorgud” - the history created and lived by the people.* Baku: Ondar publishing house. (in Azerbaijani)
**13.** Aghalarzadeh, A., & Karimov, S. (2023). The role of Heydar Aliyev in the protection of material and cultural heritage of Azerbaijan. *“Metafizika” journal, 6(1),* pp. 132-138. (in Azerbaijani)
**14.** *Order on the organization of passporting and protection of historical and cultural monuments in the territory of the Nakhchivan Autonomous Republic.* Nakhchivan city, December 6, 2005 No5-03. International Electronic Library - Heydar Aliyev Heritage Research Center. (in Azerbaijani)
www.aliyevheritage.org.
**15.** Sharifov, Sh. (2017). The city of Nakhchivan and its conquest by the caliphate. Baku: *Geostrategiya, No. 03 (39).* (in Azerbaijani)